AZƏRBAYCAN DİLİ VƏ ƏDƏBİYYAT TƏDRİSİ
2021, № 4 (270), 25-34
https://dx.doi.org/10.48445/TAIIJ.2021.46.47.002

**D İ L Ç İ L İ K   M Ə S Ə L Ə L Ə R İ**

# Aşıq Ələsgər və ədəbi dilimiz

***Sədaqət Həsənova***
Filologiya elmləri doktoru, professor, Əməkdar müəllim. Naxçıvan Dövlət Universiteti. Azərbaycan. E-mail: sedagethesenova@gmail.com
https://orcid.org/0000-0002-0839-8469

**XÜLASƏ**
Məqalədə Azərbaycan ədəbi dilinin üslub məsələlərindən danışılır. Bu məqsədlə, Aşıq Ələsgərin poeziyası linqvistik cəhətdən təhlil edilir. Aşıq Ələsgər Azərbaycan aşıq sənətinin seçilən sənətkarı, saz-söz ustadı kimi qiymətləndirilir. Onun ədəbiyyatla yanaşı, dilimizə də xidmət etməsi haqqında danışılır. Aşığın yaşadığı zamandan əvvəlki dövrlərdə Azərbaycan dilində işlənən bəzi sözlərə münasibət bildirilir, yaradıcılığındakı dil-üslub faktları üzə çıxarılır və onlar haqqında elmi-nəzəri fikirlər söylənilir. Aşıq Ələsgər Azərbaycan dilinin təbiilik və gözəlliyini diqqət mərkəzində saxlayan aşıq kimi qiymətləndirilir. Onun poeziyasındakı fərqli məqamlara diqqət edilir, işlətdiyi bədii söz və ifadələr göstərilir. Məqalədəki elmi fikirlər dil-üslub materialları ilə əsaslandırılır.

**AÇAR SÖZLƏR**
dil, üslub, söz,
ifadə, bədiilik

**MƏQALƏ TARİXÇƏSİ**
göndərilib: 02.11.2021
qəbul edilib: 10.11.2021

**MƏQALƏNİ ÇAPA MƏSLƏHƏT BİLƏN**
Filologiya elmləri doktoru, professor İsmayıl Kazımov.

TEACHING OF AZERBAIJANI LANGUAGE AND LITERATURE
2021, NO. 4, VOL. 270, 25-34
https://dx.doi.org/10.48445/TAIIJ.2021.46.47.002

LINGUISTIC ISSUES

# Ashug Alasgar and our literary language

***Sadagat Hasanova***
Doctor of Philology, Professor, Honored Teacher. Nakhchivan State University. Azerbaijan. E-mail: sedagethesenova@gmail.com
https://orcid.org/0000-0002-0839-8469

**ABSTRACT**
The article deals with the stylistic issues of the Azerbaijani literary language. For this, a linguistic analysis of the poetry of Ashug Alasgar is carried out. Ashug Alasgar is valued as an outstanding artist and master of rhetoric in Azerbaijan. It is said that it serves our language as well as literature. Some words used in the Azerbaijani language in the pre-Ashug period are considered. Linguistic and stylistic facts in the work of ashugs are revealed and scientific and theoretical opinions about them are expressed. Ashug Alasgar is valued as an ashug that enhances the naturalness and beauty of the Azerbaijani language. In his poems, attention is paid to various moments, artistic words and expressions used by the ashug are shown. The scientific ideas in the article are based on language and style materials.

**KEYWORDS**
language, style, word, expression, art

**ARTICLE HISTORY**
Received: 02.11.2021
Accepted: 10.11.2021

## Giriş / Introduction

Azərbaycan aşıq sənətinin fərqli sənətkarı kimi yaddaşlarda qalan və sevilən nümayəndəsi Aşıq Ələsgər yalnız ədəbiyyata deyil, bədii dilimizə də böyük xidmətlər göstərən dəyərli söz ustadıdır. Professor Məhərrəm Hüseynov "Aşıq Ələsgərin söz ümmanı" monoqrafiyasında onun dil-üslub xüsusiyyətləri haqqında geniş məlumat verərək, mükəmməl elmi-nəzəri təhlillərini açıqlamışdır. Aşığın ədəbi-bədii irsi dil-üslub faktları ilə o qədər zəngindir ki, o, hər dövr üçün araşdırmalara layiqdir və fikrimizcə, hər dəfəsində də burada elmi fikirlərə meydan açan faktlarla qarşılaşmaq mümkündür. Buna görə də Aşıq Ələsgər poeziyasının dilçilik elmi baxımından araşdırılması aktual məsələlərdən biridir.

Məlumdur ki, hər aşığın özünəməxsus istedadı var. Lakin Aşıq Ələsgərin istedadı öz orijinallığı və fərdiliyi ilə seçilir. Şeir sənətkarlığının əsas və ilkin şərti olan dil sadəliyi aşığın yaradıcılığında öndə dayanır. Bu sadəlik mükəmməlliyi azaltmır, əksinə, onda dərin bir sənətkarlıq əlaməti özünü göstərir.

Gözlərin görənin canını alır,
Həsrətini çəkən, vaxtsız qocalır.
Sərdarı, sultanı taxtından salır,
Bərhəm vurur ürüzgara qaşların
[1, s.61].

Aşıq verilən qoşmada qaşların vəsfində maraqlı bir mübaliğə yaradaraq, onları "sultanı taxtından salmaq" gücünə qadir olduğuna işarə edir.

Aşıq Ələsgərin kiçik həcmli əsərlərində belə böyük sənətkarlıq keyfiyyətləri duyulur. Bu əsərlərin təhlili göstərir ki, həcm həlledici deyil, əsas məsələ bədii kamillikdə, ideya dolğunluğundadır:

Gözüm qaldı hilal qaşın tağında,
Məcnun oldum, qaldım Leyli dağında.
Yazıq Ələsgəri qoca çağında,
Zülm ilə çəkdirir dara qaşların
[1, s.61].

Qoşmada adi fikirlər poetik cəhətdən fərqli şəkildə ifadə olunur. Əsərdə "dara çəkdirmək" ifadəsindən istifadə bacarığı aşığın sənətkarlıq qabiliyyəti ilə bağlı olaraq, xalq təfəkkürünü əyaniləşdirən maraqlı poetik vasitə kimi diqqət çəkir.

Çox çəkmişəm cəfa, gəl bir insafa,
And olsun müshafa, olmam bivəfa.
Gəlmişəm təvafa, verəsən şəfa,
Ələsgər xəstədi, ocağa düşdü
[1, s.86].

Burada "ocağa düşmək" ifadəsi deyimdə xalqa yönəlmək mənasında verilib. Milli xarakteri ilə yadda qalan və dilimizin təbiiliyini qoruyan belə deyimlər Aşıq Ələsgərin dilində çox işlədilmişdir. Bu dil faktları bədii mətləbin təsirli şəkildə ifadə olunmasında əvəzsiz vahidlərdir.

Gözüm qaldı siyah teldə,
Bülbül öldü meyli güldə.
Bir kəsim yox qürbət eldə,
Sən mana qəmxar ol, yaylaq!
[1, s.161].

Aşığın dilində alınma sözlər elə çevik üslub məqamlarına salınmışdır ki, onlar milli vahidlər qədər dəyərli görünür və həmişə yerinə düşür. Yuxarıda verilən nümunədə "siyah" sözü dövrümüz üçün fəallığını azaltsa da, aşığın dilində maraqlı üslub mövqeyinə salınmışdır. Belə ki, həmin sözün təsiri milli sözümüz olan "qara"nın təsirindən az deyil.

Aşıq Ələsgərin dilində təkcə üslubiyyat deyil, həm də qrammatikamız üçün maraqlı olan faktlarla da qarşılaşırıq. Məsələn, aşağıdakı nümunəyə nəzər salaq:

Ağ xalat bürünər, zərnişan geyməz,
Heç kəsi dindirib, xətrinə dəyməz.
Sərdara söz deməz, şaha baş əyməz,
Qüdrətdən səngərli, qalalı dağlar
[1, s.36].

Dilimizdəki "bürünmək" feili yönlük halda olan isimlərlə əlaqələnir. Məsələn, dumana bürünmək, şala bürünmək və s. Aşığın dilində bu feil, əslində, yönlük hal mənasında işlənən "xalat" sözü ilə əlaqələnmişdir ki, bu fakt da yönlük halın qeyri-müəyyənliyi haqqında iddia edilən fikrin doğruluğunu təsdiq edir. Bu fakt bir tərəfdən də, kamil sənətkarların bədii zövqünün yüksək, dilin leksika və qrammatikasına müdaxiləsinin fəallığını göstərir.

Aşıq Ələsgərin yaradıcılığında formaca ecazkar, məzmunca ürəyəyatımlı, ağır poetik yüklü sözlərlə təsirli məna qaynağı yaradılmış bu mənbə poetik kəşf və bədii icadlarla zənginləşmişdir:

Ala gözlüm, səndən ayrı düşəli,
Hicranın qəmiylə kef eyləmişəm.
Ah-vay ilə günüm keçib dünyada,
Qəm satıb, dərd alıb, nəf eyləmişəm
[1, s.46].

Qəmlə kef etmək, dərddən fayda, qazanc götürmək kimi dərin təzad yaratmaq aşığın bədii yaradıcılıq uğurlarından biri kimi dəyərləndirilməyə layiqdir.

Azərbaycan aşıq sənətində Aşıq Ələsgərə qədər zəngin poetik təcrübə mövcud idi. Lakin deyim tərzini gözəlləşdirmədən, yeni fikir və söz-ifadə yaradıcılığı olmadan bu sənətin inkişafı mümkün deyildir. Aşıq Ələsgərin simasında bu sahədəki yeniliklər aşıq sənətinin gələcəyinə böyük bir inam yaratmışdır.

Ələsgərəm, yandım eşq ataşında,
Gözüm qaldı kirpiyində, qaşında.
Qazdır məzarımı çeşmə başında,
Sal sinəm üstündən yol, incimərəm
[1, s.56].

Hər gün bulağa gedən sevgilisinin ayağı altında qalan məzarı ilə vüsala qovuşmaq niyyəti dahi söz ustadının bədii mətləbi haqqında bütöv bir təsəvvür yaradır. Əslində, olduqca sadə görünən bu sözlərdə bədiiliyin qatılığı son həddə çatmışdır. Aşağıdakı misralar böyük sənətkarın sözə münasibətini ifadə edir:

Arif məclisində bir söz söylərəm,
Nə hədyan, nə çaşqın, nə qələt olmaz.
Nüftədən pak olan, loğmadan halal
Mərifət elminə nabələd olmaz
[1, s.70].

Bədii dili kamilləşdirmək şeir sənətinin əsas məsələlərindən biridir. Bu kamilliyin zirvədə olması Aşıq Ələsgərin sözlərin semantikasını əyaniləşdirmək bacarığında təsdiq olunur.

Hazır poetik qəliblərdən uzaq olan, ənənəvi məcazlardan daha çox özünəxas məcazlarla aşıq sənətinə bədii zəriflik gətirən Aşıq Ələsgər dərin dil duyumuna malik

olmuşdur. Onun təhsil almadığı haqqında məlumatları oxuduqca, təsəvvürə gətirmək mümkün olmur ki, təhsil almayan bir insan linqvistika ilə poeziyanı birləşdirən bu qədər gözəl fikirlər irəli sürsün. Aşıq o zamankı əlifbada (ərəb əlifbasında) əks olunan hərfləri nəzmə çəkmiş, onların dini-fəlsəfi mənalarını ustalıqla açmışdır:

“Se” – sabitdi doğru yola,
“Sim” – ucadı, bax calala,
“He” – mehribandı halala,
Münkir ondan xəcalətdi.

“Xe” – birdi, xaliqi-əkbər,
“Dal” – doğru doqquz fələklər,
“Zal” – zikr eylə dildə əxbər,
“Re” – rəsulumuz Əhməddi
[1, s.23].

Aşıq sözügedən şeirdə 24 hərf haqqında maraqlı fikirlər irəli sürərək, elmiliklə bədiiliyi qovuşdurmuşdur. Əlifbadakı hərflər haqqında aşıq poeziyasında heç kəs Aşıq Ələsgər qədər məntiqli bədii fikirlər söyləməmişdir.

Aşıq Ələsgərin yaradıcılığında sözün əhəmiyyəti qabarıq görünərək poetik təəssüratı genişləndirir. Dəbdəbədən uzaq, təbii tərənnüm onun əsərlərinin mayasını təşkil edir və səmimiliyə yeni imkanlar açır. Aşığın dilində sözlər sanki “qoçaqlaşır”, bir-biri ilə məna, məntiq yarışına girir. Bu çeviklik poetik dilin məziyyətini əsaslandırır. Sözlər bədii məzmun ifadə etmək üçün üslub rənglərinə boyanır:

Gərdəninə neçə şahmar dolanıb,
Könül istər, o şahmara dolansın.
Ərzim alıb iltimasım tutmasan,
Məcnun olsun, bu dağlara dolansın
[1, s.40].

Uzun saçın şahmar ilana bənzədilməsi klassik təşbehdir və aşığın dilində metonomiya səciyyəsindədir. Lakin könülün o şahmara – gözəlin saçına dolanması tamamilə yeni üslub faktıdır. Doğrudan da, dil poeziyanın estetik funksiyasını fəallaşdırır, fərdi deyim xaslığı, hiss və duyğular isə sözə yeni istiqamət verir.

Poetik dilin yaradıcısı söz sənətkarlarıdır. Ona görə də bu dilin formalaşma, inkişaf və təkmilləşməsində hər bir ədəbi simanın müəyyən qədər rolu vardır. Aşıq

Ələsgərin yaradıcılıq siması onun yaşadığı dövrün poetik dil xüsusiyyətlərinin mənzərəsini yetərincə canlandıra bilir.

Bədii amillər canlı danışıq materialının sürətli işlənməsini tələb edərək, dilin sadəlik və gözəlliyini təmin edir. Belə olan halda, dərin bədii məntiq insanı daha çox cəlb edir. Aşığın poetik dili ona görə səciyyəvidir ki, onda quru, standart dil modelləri yoxdur, burada düşüncələrə uyğun təbii, axıcı söz və ifadələr hökmrandır. Təkcə "Düşdü" qoşmasını nümunə göstərmək kifayətdir ki, Aşıq Ələsgərin dil-üslub xüsusiyyətləri üzə çıxarılsın:

Çərşənbə günündə çeşmə başında
Gözüm bir alagöz xanıma düşdü.
Atdı müjgan oxun, keçdi sinəmdən,
Cadu qəmzələri qanıma düşdü
[1, s.44].

"Gözün düşməyi", "kirpiklərdən ox atmaq", "cadu-qəmzələrin qana düşməyi" kimi estetik zövqə, forma və məzmun gözəlliyinə malik dil materialı ilə bəzənən bu bədii parçada fikirlər çoxalıb inkişaf etdikcə, özünə uyğun ifadə tərzi axtarır və buna nail olur. Dil fikirlə bağlıdır və bədii məqsədi ifadə edən fikirlər yeni dil faktlarına meydan açaraq sözlərə təsir edir. Fikir gözəl olduqda, söz də gözəl səslənir. Səviyyəli məzmun özünəmüvafiq forma tələb edir.

İşarət eylədim, dərdimi bildi,
Gördüm, həm gözəldi, həm əhli-dildi,
Başını buladı, gözündən güldü,
Güləndə qadası canıma düşdü
[1, s.44].

"Gözdən gülmək", "əhli-dil" (eşq əhli, ürək əhli) olmaq, "cana qada düşmək" kimi ifadələr bədii dilin mahiyyətini daha da artırır. Adi sözlər heç vaxt poetikləşə bilməz. Əsl sənətkar dilin xəlqi xarakterinə sadiq qalaraq, sözlərdən elə məharətlə istifadə edir ki, onlar gözlənilməz mənaların tərənnümçüsünə çevrilir. Bu mənada, Aşıq Ələsgərin sözlərlə rəftarı onun bədii məzənnəsini təyin edə bilir.

Ələsgərəm, hər elmdən halıyam,
Gözəl, sən təbibsən, mən yaralıyam,
Dedi nişanlıyam, özgə malıyam,
Sındı qol-qanadım yanıma düşdü
[1, s.44].

Bu əsərlə "görmək, tanış olub sevmək, ürəyini açmaq və sonunda ümidsizliyə uğramaq" kimi ünsürləri özündə yaşadan maraqlı bir süjetin lirikaya gəlməsi bədii tapıntılardan biridir. Sözsüz ki, bu prosesdə dil əvəzsiz rola malikdir. Hər bir qələm sahibinin dili onun ədəbi aləmdə bədii mövqeyini müəyyənləşdirir.

Aşıq Ələsgərin yaradıcılığı belə bir gerçəkliyi bir daha vurğulayır ki, dil poeziyada dinamikliyi ilə səciyyəvidir və sözləri müxtəlif istiqamətlərə döndərə bilir. Aşıq həm əzəli dilimizə sadiq qalır, həm də ona üslub məziyyətləri ilə səciyyələnən bədii vahidlər əlavə edib zənginləşdirir:

Adım Ələsgərdi, əslim Göyçəli,
Ələst aləmində demişəm "bəli!".
Həm aşiqəm, həm dərvişəm, həm dəli,
Canım gözəllərin yol qurbanıdır
[1, s.44].

Buradakı "gözəllərin yol qurbanı" söz birləşməsi də maraqlı poetik sintaksis materialı kimi diqqət çəkir. Söz sənətkarlığının səviyyəsini yüksəldən faktor – xalq təfəkkürünə uyğun aydınlıq Aşıq Ələsgərin bütün yaradıcılığında özünü göstərir. O, dilimizin təbii axar imkanlarını çoxaldıb onun canlı nəfəsini artıraraq, bədii mətləbləri uğurlu dil vahidləri ilə ifadə edib xalq deyimlərinin şirinliyini qoruyaraq, danışıq-ünsiyyət leksikasının daha geniş sahəyə malik olmasını əsaslandırır:

Fərhad gördü, sevdi Şirin camalın,
Şirin dost əlindən şirin cam alın,
Şirincə dövlətin, şirincə malın
Axır zəhrimara döndü, nə döndü!
[1, s.41].

Bu örnəkdə "şirin" sözünün üslub çalarları, 3-cü misrada sifətin çoxaltma dərəcəsini göstərən qüvvətləndirici ədatla işlənməsi əsrarəngiz fonetik poetikanın əlamətləri kimi diqqət cəlb edir. Bu sözün sürətlə bədii mühitə daxil olması onun poetikləşmə xarakterini gücləndirir, bununla da adi leksik-qrammatik vahidin üslubi potensial imkanları açılır.

Kamil ovçu ölməyincə usanmaz,
Əldən qoymaz belə sərxoş maralı.
Eşq oduna düşən aşkara yanmaz,
Pünhan-pünhan mənim kimi saralı.

Əsərdə dildəki adlar sırasına daxil olan "maral" isminə qafiyə olsun deyə, hərəkət bildirən sözlər arasından "saralmaq" feilinin seçilməsi aşığın sənətkarlıq qabiliyyətindən irəli gəlir. Maraqlı faktlardan biri də budur ki, Aşıq Ələsgər müxtəlif nitq hissələrini qafiyələrə tabe etdirə bilən sənətkarlardandır.

Aşıq Ələsgər qoşmalarının birində deyir: "Sözüm bəyənilib, işim saz olub" [1, s.46]. Ümumxalq danışığına dərin nüfuz, üslub cəhətdən seçilən ifadə üsulları, çoxmənalı zəngin sözlər aşığın yaradıcılıq uğurlarındandır.

Ələsgərəm, bir gözələ mehmanam,
Ölməyincə çətin dönəm, usanam.
Əzrayılı qanlı tutmasın anam,
Məni bir kirpiyi peykan öldürür
[1, s.73].

Burada "qanlı tutmaq" məcazından başqa, "kirpiyi peykan" qeyri-təyini söz birləşməsi şeirin bədii təkamülünü səciyyələndirir. Şeir dilində sözün canlı olması onun kəsəri və əhəmiyyətini daha da artırır.

İltimas eylərəm gedən canlardan,
Dost-düşman içində yar oynamasın.
Cavandı, oynamaq ona xoş gəlir,
Bizə əskikliyi var, oynamasın!
[1, s.73].

Xalq danışığı elementlərinin bədii nitqə daxil edilməsi təqdirəlayiq addımdır. Xalq deyimlərini, milli təfəkkürün yüzilliklərdən bəri axıb gələn göstəricilərini şeirə yaraşdıran və uyğunlaşdıran sənətkar kimi Aşıq Ələsgərin ədəbi dil tariximizdə müstəsna xidmətləri vardır.

Ələsgərəm, eşq yolunda sarışdım,
Firqətindən yandım, yandım, alışdım.
Gizlin sirrim mən Loğmana danışdım,
Sənsiz bu dərdimə heç dərman olmaz
[1, s.71].

Şeirin dilindəki "sarışmaq" (qucaqlaşmaq, bir-birinə sarılmaq, dolanmaq) sözü maraqlı dil vahidlərindəndir. Bu sözə "Azərbaycan dilinin dialektoloji lüğəti"ndə rast gəlinmir. Lakin izahlı lüğətdə onun *titrək, zəif işıq saçmaq, şəfəq buraxmaq, qaçışmaq* mənaları verilmişdir [3, s.52]. Aşıq Ələsgər artıq unudulmaq təhlükəsi

yaşayan, lakin bədii dildə hələ də işlək olan bu sözü maraqlı üslub məqamına salmışdır. Bundan başqa, əsərdə sinonim cərgələrin genişlənməsi amilinə də rast gəlinir.

**Nəticə / Conclusion**

Aşıq Ələsgərin poeziyası hikmətli fikirlər qaynağıdır. Belə ki, onun poeziyasında çoxsaylı nəsihət məzmunlu misralar vardır:

Yüz namərdlə şəkər yesən, dad olmaz,
Yüz il keçsə, qohum sənlə yad olmaz.
Mərd bir olar, onda iki ad olmaz,
Göz gözə baxmasa, mehriban olmaz
[1, s.71].

Verilən misraların hər birində bədii bitkinlik özünü göstərir.

Beləliklə, Aşıq Ələsgər Azərbaycan aşıq sənətində özünəxas imza qoymuş, yaratdığı zirvə ucalığından heç bir zaman aşağı enməmiş, aşıq sənətində özünəqədərki təcrübəni təkmilləşdirərək ona yeni dil-üslub keyfiyyətləri əlavə etmişdir.

**İstifadə edilmiş ədəbiyyat / References**

1. Aşıq Ələsgər. (2004). Əsərləri. Bakı, Şərq-Qərb.
2. Azərbaycan dilinin dialektoloji lüğəti. (2007). Bakı, Şərq-Qərb.
3. Azərbaycan dilinin izahlı lüğəti, IV cild. (2006). Bakı, Şərq-Qərb.
4. Hüseynov M. (2008). Dil və poeziya. Bakı, Elm.
5. Hüseynov M. (2009). Poeziya dilinin milli qaynaqları. Bakı, Elm və təhsil.
6. Hüseynov M. (2010). Sözün poetikası. Bakı, Elm və təhsil.
7. Hüseynov M. (2010). Səsin poeziyası. Bakı, Elm və təhsil.